**UOT: 339.924**

# İXRAC YÖNÜMLÜ İSTEHSAL SAHƏLƏRININ MODERNLƏŞDİRİLMƏSİ

**T.M.RƏHİMOVA**
**AKTN Kənd Təsərrüfatının İqtisadiyyatı ET İnstitutu**

*Məqalədə ixrac yönümlü fəaliyyətin müasir tələblərə uyğun təşkili məsələləri araşdırılır. Həmçinin ixrac siyasətində istehsalın modernləşdirilməsinin əhəmiyyəti və səmərəliliyin artırılmasında rolu şərh edilir. Xüsusilə aqrar sahədə ixrac yönümlü məhsul istehsal edən müəssisələrin modernləşdirilməsinin vacibliyi və yüksək standartlara uyğun yeni məhsulların zəruriliyi vurğulanır.*

***Açar sözlər:*** *modernləşdirmə, ərzaq təhlükəsizliyi, ixrac yönümlü fəaliyyət, aqrar sahə, rəqabətə davamlılıq, innovativ texnologiyalar.*

Aqrar sənaye müəssisələrinin ixrac potensialının artırılması baxımından rəqabət qabiliyyətinin yüksəldilməsi və modernləşdirilməsi müasir dövrün ən aktual məsələlərindən biridir. Belə ki, ixrac yönümlü məhsul istehsal edən müəssisələrin modernləşdirilməsi bu sahədə məhsuldarlığın artırılmasına gətirib çıxarır.

İxrac yönümlü məhsul istehsal edən müəssisələrdə modernizasiya siyasətinin əsas sahə prioritetlərini müəyyən etmək üçün müxtəlif elmi yanaşmalardan istifadə etməklə kənd təsərrüfatı və ərzaq sənaye məhsullarının istehsalı sahəsində rəqabət üstünlüyünə malik və ixrac yönümlü sahələr seçilməsi vacibdir. Bu zaman aşağıdakı prinsiplərin əsas götürülməsi məqsədəuyğundur:

- dövlət siyasəti;
- iqtisadi təhlükəsizlik;
- məşğulluğun artırılması;
- ərzaq təhlükəsizliyi;
- innovasiya;
- ekoloji tarazlıq;
- regional tarazlıq;
- geoiqtisadi tarazlıq və s.

Hazırda Azərbaycanda bütün bu sahələrin geniş tərkibdə inkişafı üçün böyük imkanlar vardır və lazımi şərait yaranmışdır [2, s 391]. İxrac məhsulunun istehsalının dəyər zəncirində mümkün qədər daha çox həlqələrin əhatə edilməsinə nail olunması, xammal və yarımfabrikatların ixracından daha çox hazır məhsul istehsalına keçidin təmin edilməsi modernizasiya siyasətinin əsas məqsədidir. Dəyər zəncirini aşağı və yuxarı istiqamətlərdə genişləndirmək ixtisaslaşmanın artması, resursların səmərəli istifadəsi və müsbət reputasiya yaranması baxımidan mühümdür. Nəticədə isə ixrac məhsullarının rəqabətə davamlılığı arta bilər. Bu zaman əsas vacib şərtlərdən biri biznes modelin seçilməsi sayılır ki, həmin model də ixrac klasteri, kooperasiya və ya “bir kənd bir məhsul” ola bilər. Aparılan tədqiqatlara əsaslanaraq demək olar ki, məhsuldarlığın artırılması və innovativ inkişafı təmin edilməsi baxımından əlaqəli iqtisadi fəaliyyətlərin coğrafi yaxınlığı mühüm rol oynaya bilər.

Kənd təsərrüfatı və ərzaq məhsullarının ixracının rəqabətə davamlılığı modernizasiya yolu ilə artırılmalıdır. Bu daha az xərclə daha yüksək keyfiyyətli məhsul istehsalı deməkdir. Belə ki, ixrac və idxal məhsullarının əsas istehsal amilləri və mütərəqqi amillər əsasında istehsalı səviyyəsi müəyyən edilməlidir. İxrac məhsulları daha çox texnologiya və ixtisaslı əmək hesabına istehsal olunarsa bu o deməkdir ki, ölkə üstünlüyə malikdir. Azərbaycanda ixrac məhsullarının daha çox modern innovativ texnologiyalar və yüksək ixtisaslı əmək əsasında istehsal edilməsinə çalışılmalıdır. Bunun üçün isə yüksək səviyyəli maliyyələşdirmə mənbələrinin mövcudluğu tələb olunur.

İstehsalın modernləşdirilməsində ən əsas yerlərdən birini texnikanın və texnologiyanın tətbiqi durur. Rəqabət mübarizəsində qalib gəlməyin ən əsas şərtlərindən biri müəssisəni, yeni müasir avadanlıqlarla təchiz etmək şərtilə yeni üstün məhsulların istehsalının mənimsənilməsidir. Bu zaman uzun illər bu üstünlüyü əldə saxlamaq lazımdır. Yeni məhsulların işlənib hazırlanmasının əsas məqsədi bazar uğrunda mübarizədir və bu istehlakçıların və ticarət vasitəçilərinin marağı da nəzərə alınmalıdır. Yeni texnologiya məhsulun istehsal xərclərinin aşağı salınması məhsulun keyfiyyətinin və etibarlılığının yüksəldilməsi, istehsalın çevikliyinin artırılması hesabına müəssisənin bazarda rəqabət qabiliyyətinin yüksəldilməsini təmin edir. Yeni məhsulun işlənilməsi və yeni texnologiyanın yaradılması müəssisənin ümumi səmərəliliyini artırır.

Azərbaycan Respublikasında sosial-iqtisadi inkişafın sürətləndirilməsi və ölkənin bütün regionlarının bu mühüm prosesə cəlb edilməsi məqsədi ilə onların mövcud sərvətlərindən və imkanlarından səmərəli istifadəyə nail olunması və

regionların sosial-iqtisadi inkişafını yüksəltməsi obyektiv zərurət təşkil edir [3, s 166]. Aparılan təhlil nəticəsində müəyyən edilmişdir ki, müəssisənin yeni məhsul istehsal etmək qabiliyyəti gələcək müvəffəqiyyətin əsas amilidir. Lakin, bu qabiliyyət sadəcə olaraq müəssisənin, tədqiqat xidmətlərinə diqqətin artırılması deyildir. Bu müəssisənin idarəetmə aparatının bütün bölmələrinin bacarıqlı inteqrasiyasıdır. Yeni məhsulun yaradılması layihələrinə ənənəvi yanaşma ondan ibarətdir ki, idarəetmə aparatının hər bir xidmət bölməsi, özlərinin məhdud rolunu yerinə yetirilər: mühəndislər yeni məmulatı işləyib hazırlayırlar, istehsalçılar onun istehsala hazırlanması ilə məşğul olurlar, marketinq və təchizat işçiləri isə məhsulun reallaşması ilə məşğul olurlar. Hər bir belə xidmət sahələrinin işinin səmərəliliyinin müəyyən edilməsi üçün məhdud meyarlardan istifadə edilir. Mühəndis layihəsi üçün yeni məmulatın yaxşı işlənilməsi konstruksiyası əsas göstərici hesab olunur. Bu konstruksiya elə olmalıdır ki, mövcud analoji məhsulların konstruksiyalarından üstün olsun. Lakin müasir rəqabət şəraitində yeni məhsulun xarakteristikaları tamamilə başqa meyarlar əsasaında ölçülür. Bundan əlavə aqrar sektorda həyata keçirilən islahatlar bu sahəyə kadr tələbatını da müəyyən etməli, müvafiq rəqabət mühiti formalaşdırmalı və kadrların hazırlanması prosesinə oz təsirini göstərməlidir [4, s 141].

Ən başlıcası həmin məhsulun daha gərəkli olması, istehlakçılar üçün daha çox lazım olmasıdır. Bu zaman həmin məhsulun mövcud dünya standartlarına uyğun gəlib gəlməməsi bir o qədər də vacib deyildir. Bu o deməkdir ki, istehlakçı aşağı qiymətə daha yüksək məhsul ala bilsin. Məhz, dünya səviyyəli istehsalın mahiyyəti bununla səciyyələnir. Buna nail olmaq üçün yeni məhsul layihələndirilərkən onu hazırlayanlar, reallaşdırılanlar, birgə işləməlidirlər və bir yekun məqsədə xidmət etməlidirlər. Çox təəssüf, hal-hazırda əksər dünya texnologiyalı müəssisələr və kiçik müəssisələr qiymət və qeyri-qiymət rəqabətinə əsaslanaraq yeni məhsulların işlənilməsinə köhnə qaydada yanaşırlar. Tam yeni məmulatların eyni zamanda onun istehsalı texnologiyaların işlənilməsi çox böyük hazırlıq işlərinin aparılması və bu məqsədə kifayət qədər maliyyə resurslarının ayrılmasını tələb edir.

Təbii ki, elmi-texniki tərəqqinin maliyyələşdirilməsi sahəsində məsrəflərdə birliklərin və müəssisələrin öz vəsaitinin payının artırılmasına və büdcə vəsaitinin azaldılmasına, texniki tədbirlərin həyata keçirilməsinə və işləyən müəssisələrin texnika ilə yenidən təchiz edilməsində bank kreditlərinin genişləndirilməsinə çalışmaq lazımdır. Fiziki və mənəvi köhnəlmə üzündən sıradan çıxan maşınların əvəzinə yenilərini almaq və avadanlığı modernləşdirmək üçün amortizasiya ayırmalarından tam istifadə etmək lazımdır. Yeni texnikaya məsrəflərin maliyyələşdirilməsi metodları sahəsində qeyd edilən tədbirlər əsaslı vəsait qoyuluşlarından daha yaxşı istifadə etməkdə maddi maraq yüksəldir, məsuliyyəti artırır. Kreditin qaytarma, təcililik və məqsədli xarakteri kimi xüsusiyyətləri yeni texnikanın iqtisadi səmərəliliyinin yüksəldilməsinə kömək edir. Yeni texnika vasitələrinə qiymətqoymanın təkmilləşdirilməsi elmi-texniki tərəqqinin iqtisadi stimullaşdırılmasının mühüm formasıdır [1]. Qiymətlər daha mütərəqqi məhsul növlərinin istehsalını və onun keyfiyyətinin yaxşılaşmasını stimullaşdırmalıdır. Qiymətlər həmçinin yeni texnikanın səmərəlilik meyarlarından biri rolunu oynayır, çünki, onların kəmiyyətinə görə faydalı səmərə vahidinə, ictimai əmək məsrəflərinin azaldılmasında qiymətlərin rolu barədə mülahizə yürütmək olar. Yeni texnika vasitələrinin qiyməti onların hazırlanması və istismarına çəkilən ictimai məsrəflərə əsasən müəyyən edilməlidir. Bu qiymətlər həm yeni texnikanı hazırlayanların, həm də istehlakçıların marağını stimullaşdırmalıdır. Bu tələblər qiymətqoyma praktikasında pilləli qiymətləri tətbiq etmək yolu ilə həyata keçirilir; preyskuranta daimi topdansatış qiyməti ilə yanaşı, yeni texnika üçün dəyişən qiymətlər də daxil edilir ki, bu da texnikaya məsrəflər azaldıqca müntəzəm olaraq aşağı salınır. Seriyalı buraxılış artdıqca və yeni texnika vasitələrinin istehsalı mənimsənildikcə onların maya dəyəri aşağı düşür, bununla əlaqədar olaraq onların qiyməti də aşağı düşməlidir. Yeni texnikanın istehsalını mənimsəyən müəssisələr müvəqqəti əlavə məsrəfləri ödəməlidirlər. Lakin bu məsrəfləri qiymətə daxil etmək lazım deyildir, çünki, yeni texnikanı istehlak edən müəssisələr üçün onu almaq əlverişli olmaz. Aqra iqtisadiyyat kompleksinin səmərəli və dayanıqlı inkişafının vacib şərtlərindən biri onun lazımi investisiyalaşmasıdır. Aqrar siyasətin əsas məqsədi, aqrar iqtisadiyyatın investisiyalaşdırılması üçün əlverişli şəraitin yaradılmasıdır [5, s 188]. Dəyişən qiymətlər bu ziddiyyətin həll edilməsinə kömək edir. Yeni texnikanın qiymətlərini işləyib hazırlayarkən yeni texnikanı hazırlayan müəssisələrin onun istehsalına çəkdikləri məsrəfləri ödəməklə yanaşı, mənimsənilmiş məhsul istehsalında olduğundan daha yüksək mənfəət təmin etməyin məqsədəuyğunluğunu nəzərə almaq lazımdır. Texnikanın yeni növlərinin istifadəyə verilməsi və ya köhnə texnikanın yenisi ilə əvəz olunması zamanı istehsalın yenidən qurulmasının təşkili nə qədər mükəmməl olsa da, yeni istehsalın mənimsənilməsinin obyektiv şəraitindən irəli gələn itkilər yaranır. Bu ixrac yönümlü məhsul istehsal

edən müəssisələrin iş göstəricilərinin pisləşməsində - satışın həcmində, mənfəətdə, rentabellikdə, xüsusi texniki iqtisadi göstəricilərdə təzahür edir. Bunlar onu deməyə əsas verir ki, modernizasiya aqrar sahənin texniki-texnolji yenilənməsini ehtiva edir.

Deməli, aqrar sahədə ixrac yönümlü məhsul istehsal edən müəssisələrin modernləşdirilməsi aşağıdakılara səbəb ola bilər:

- Aqrar istehsalın rəqabətqabiliyyətini yüksəldər və ixrac imkanlarını genişləndirər;
- İxrac yönümlü məhsul istehsal edən müəssisələrin modernləşdirilməsi nəticəsində aqrar sahədə kapitalın məhsuldarlığı artar və daha yüksək ixtisaslı əmək qüvvəsinə tələbat yaradar;
- Aqrar sahənin təşkilati-idarəetmə mexanizminin inkişafına təkan verər;
- Aqrar sahəyə xidmət edən infrastrukturların inkişafını təmin edər;
- Aqrar sahəyə xarici investisiyaların cəlbediciliyini stimullaşdırar və s.

Bütün bunlar aqrar sahədə ixrac yönümlü məhsul istehsal edən müəssisələrin modernləşdirilməsinin iqtisadi səmərəliliyinin yüksəldilməsinin nə qədər mühüm əhəmiyyət kəsb etdiyini göstərir.

## ƏDƏBİYYAT

1. Musayev M.Q. Aqrar sahədə intensiv inkişafın iqtisadi problemləri. Bakı, 2007. 2. Nadirov A.A. Müstəqil Azərbaycan iqtisadiyyatının inkişaf məsələləri. Bakı, Elm, 2001. 452 səh. 3. Qarayev İ.Ş. Aqrar sferanın iqtisadiyyatı və idarə edilməsi. Dərslik. Bakı, “İqtisad Universiteti” Nəşryyatı, 2011.522 səh. 4. Qasımlı V. İqtisadi modernizasiya. Bakı, 2014. 312 səh. 5. Quliyev E.A. Aqrar iqtisadiyyat. Ali məktəb tələbələri üçün dərslik. Bakı, “Kooperasiya” nəşriyyatı, 2015. 320 səh.

## Модернизация экспортно-ориентированного производства

**Т.М.Рахимова**

В статье рассматриваются вопросы экспортно-ориентированной деятельности в соответствии с современными требованиями. Объясняется роль модернизации производства в экспортной политике и роль повышения эффективности. В частности, подчеркивается необходимость модернизации сельскохозяйственного сектора, производящего предприятия, ориентированные на экспорт, и важность новых продуктов по самым высоким стандартам.

***Ключевые слова:*** *модернизация, продовольственная безопасность, экспортно-ориентированная деятельность, аграрный сектор, конкурентоспособность, инновационные технологии.*

## Modernization of export - oriented production fields

**T.M.Rahimova**

The article examines the issues of export - oriented activities in accordance with modern requirements. The role of modernization of production in the export policy and the role of increasing efficiency are explained. In particular, stresses the need for modernization of the agricultural sector producing export-oriented products enterprises and the importance of new products to the highest standards.

***Key words:*** *modernization, food safety, export-oriented activities, agriculture, competitiveness, innovative technologies.*

tubu.rehimova@bk.ru